# POLITICAL ACTIVITY OF HEYDAR ALIYEV

**Aynur Aliyeva**[1]

УДК 323.
КВТ 63.3 -4

**Keywords:**

State
Economics
Administration
Society
Foreknowledge
Worldview

## ABSTRACT

Heydar Aliyev's state policy aimed at strengthening the statehood consciousness which gave its results after gaining independence. As a result of his policy, all the problems that damaged the souverity and independence of the Republic have been eliminated. One of the biggest cases committed by respected Heydar Aliyev was precisely the establishment of stability and order in the country. In accordance with these aspects, H. Aliyev's state policy is a model of democratic governance not only in the South Caucasus, but throughout the post-Soviet space. He could also bring people together in the fight against the enemy.

The great events held in Azerbaijan today prove once again that the immortal ideas of Heydar Aliyev are everlasting and eternal. The foresight, wisdom and self-sacrifice of the Great Leader have elevated this personality to the leadership not only of the Azerbaijani people, but of Azerbaijanis all over the world, and his life has become a shining example of service to the motherland. National Leader Heydar Aliyev, who devoted his entire life to his people and homeland, entered the history of the Azerbaijani people as the architect and founder of our independence. The tireless, multifaceted and rich activity of the Great Leader has put Azerbaijan on the path of rapid development, and there is no doubt that in the coming years our country will become one of the strongest developing countries in the world.

We are witnessing how the world famous people spoke with admiration and respect about Heydar Aliyev, a rare person who became a legend in his life and conquered the political olympus. Recognized worldwide by contemporary world leaders, prominent statesmen and politicians, including former US President George W. Bush's "undisputed leader", Turkish President Recep Tayyip Erdogan's "recognized and loved leader of the Turkic world", Russian President Vladimir Putin's The "political giant", the "extraordinary personality" of the former President of France Jacques Chirac, the greatness of the personality of Heydar Aliyev is reviving these days, and feelings of pride and pride are once again in our hearts.

[1]. Staff member of the Presidium of ANAS
aynurismayilova05@mail.ru

*Received: 14.07.2020*
*Accepted: 04.12.2020*

ISSN: 2710-9960 (Print)
ISSN: 2710-8432 (Online)

JOURNAL OF "HISTORY OF SCIENCE"
Cild 1, Say 2, Sıra 2, 2020, 43-52

# HEYDƏR ƏLİYEVİN SİYASI FƏALİYYƏTİ

**Aynur Əliyeva**[1]

УДК 323.
КВТ 63.3 -4

**Açar sözlər:**

Dövlət
İqtisadiyyat
İdarəçilik
Cəmiyyət
Uzaqgörənlik
Dünyagörüşü

## ANNOTASİYA

Heydər Əliyevin uzaqgörənliyi dövlətçilik şüurunun gücləndirilməsinə yönəlmişdir ki, bu siyasət müstəqillik əldə etdikdən sonra öz bəhrəsini verdi. Onun siyasəti nəticəsində Respublikanın suverenliyinə və müstəqilliyinə zərər verən bütün problemlər aradan qaldırılmışdır. O, həmçinin düşmənlə mübarizədə xalqı bir araya yığa bildi. Cənab Heydər Əliyev tərəfindən yerinə yetirilmiş ən önəmli işlərdən biri ölkədə sabitliyin və əmin –amanlığın yaradılmasıdır. Bu baxımdan Heydər Əliyevin dövlətçilik siyasəti nəinki Cənubi Qafqazda, hətta bütün postsovet məkanında demokatik idarəçilik nümunəsi hesab olunur. Hər kəs onun kütləni düşmənə qarşı necə səfərbər etdiyini yaxşı xatırlayır.

Bu gün Azərbaycanda həyata keçirilən böyük tədbirlər məhz Heydər Əliyevin ölməz ideyalarının həmişəyaşar, əbədi olduğunu bir daha sübut edir. Ulu Öndərin uzaqgörənliyi, müdrikliyi və fədakarlığı bu şəxsiyyəti təkcə Azərbaycan xalqının deyil, bütün dünya azərbaycanlılarının liderliyinə yüksəldib, ömür yolu isə vətənə xidmətin parlaq nümunəsinə çevrilib. Bütün həyatını xalqına və vətəninə həsr etmiş Ümummilli Lider Heydər Əliyev Azərbaycan xalqının tarixinə müstəqilliyimizin memarı və qurucusu kimi daxil olub. Ulu Öndərin yorulmaz, çoxşaxəli və zəngin fəaliyyəti Azərbaycanı sürətli inkişaf yoluna çıxarıb və şübhə yoxdur ki, yaxın illərdə ölkəmiz dünyanın inkişaf edən güclü dövlətlərindən birinə çevriləcək.

Hələ sağlığında əfsanələşən, siyasət olimpini fəth etmiş nadir şəxsiyyət Heydər Əliyev haqqında dünyanın məşhur simalarının necə heyranlıqla, ehtiramla danışdıqlarının şahidiyik. Müasiri olan dünya liderləri, tanınmış dövlət adamları və siyasi xadimləri tərəfindən dünya miqyasında böyüklüyü etiraf edilən, o cümlədən ABŞ-ın sabiq Prezidenti Corc Buşun "şəksiz lider", Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğanın "türk dünyasının tanınan və sevilən lideri", Rusiya Prezidenti Vladimir Putinin "siyasi nəhəng", Fransanın sabiq Prezidenti Jak Şirakın "qeyri-adi şəxsiyyət" adlandırdıqları Heydər Əliyev şəxsiyyətinin nəhəngliyi bu günlərdə yenidən göz önündə canlanır, qəlbimizdə bir daha qürur və iftixar hissləri baş qaldırır.

[1]. AMEA Reyasət Heyəti aparatının əməkdaşı
aynurismayilova05@mail.ru

*Məqalə redaksiyaya daxil olmuşdur: 14.07.2020*
*Təkrar işlənməyə göndərilmişdir: 07.09.2020*
*Çapa qəbul edilmişdir: 04.12.2020*

# ПОЛИТИЧЕСКАЯ ДЕЯТЕЛЬНОСТЬ ГЕЙДАРА АЛИЕВА

**Айнур Алиева**[1]

УДК 323.
КВТ 63.3 -4

**Ключевые слова:**

Государство
Экономика
Администрация
Общество
Предвидение
Мировоззрение

**АННОТАЦИЯ**

Политика Гейдара Алиева направленная на усиление сознания государственности, дала всходы после обретения независимости. В результате его политики были убраны все проблемы наносящие вред суверенитету и независимости Республики. Без сомнений в этом процессе особенно нужно отметить феномен Гейдара Алиева. Одним из самых больших дел, совершенных уважаемым Гейдаром Алиевым, было именно установление стабильности и порядка в стране. В соответствии с этими аспектами политика государственности Г. Алиева является моделью демократического управления не только на Южном Кавказе, но и на всем постсоветском пространстве. Все хорошо помнят его способности мобилизации масс на борьбу врагом.
Проведенные сегодня в Азербайджане великие события еще раз доказывают, что бессмертные идеи Гейдара Алиева вечны и вечны. Дальновидность, мудрость и самопожертвование Великого Вождя возвысили эту личность до лидеров не только азербайджанского народа, но и азербайджанцев всего мира, а его жизнь стала ярким примером служения Родине. Общенациональный лидер Гейдар Алиев, посвятивший всю свою жизнь своему народу и Родине, вошел в историю азербайджанского народа как архитектор и основатель нашей независимости. Неутомимая, многогранная и богатая деятельность Великого Вождя вывела Азербайджан на путь стремительного развития, и нет никаких сомнений в том, что в ближайшие годы наша страна станет одной из сильнейших развивающихся стран мира.
Мы являемся свидетелями того, как всемирно известные люди с восхищением и уважением отзывались о Гейдаре Алиеве, уникальном человеке, который стал легендой в своей жизни и покорил политический олимп. Признанный во всем мире современными мировыми лидерами, видными государственными деятелями и политиками, в том числе «бесспорным лидером» бывшего президента США Джорджа Буша, «признанным и любимым лидером тюркского мира» президента Турции Реджепа Тайипа Эрдогана, «политическим гигантом» президента России Владимира Путина, «неординарная личность» бывшего президента Франции Жака Ширака, величие личности Гейдара Алиева возрождается в наши дни, и чувства гордости и гордости снова в наших сердцах.

[1]. Сотрудница аппарата Президиума НАНА
aynurismayilova05@mail.ru

ISSN: 2710-9960 (Print)
ISSN: 2710-8432 (Online)
JOURNAL OF "HISTORY OF SCIENCE"
Cild 1, Say 2, Sıra 2, 2020, 43-52

## GİRİŞ

Xalqın səadəti və gələcəyi ilk növbədə dövlətə rəhbərlik edən şəxsin siyasi idarəçilik dünyagörüşündən, idarəçilik istedad və bacarığından asılıdır. Öz xalqının və ölkəsinin liderləri yaşadıqları cəmiyyətin tələbatlarına uyğun olaraq onu dəyişdirməyi və inkişaf etdirməyi bacarırlar. Elm, istedad və çalışqanlıq nəticəsində insanlar həyatı dərk edir, yaşadıqları cəmiyyətin tələbləri əsasında onu dəyişdirir və inkişaf etdirirlər. Bütün hallarda elmi fəaliyyət və təlim tərbiyə düzgün təşkil edilməlidir.

Heydər Əliyevin Azərbaycan xalqı qarşısında böyük xidmətlərindən söhbət açanda ilk öncə 1969-1982-ci illərə, onun Sovetlər birliyi dövründə respublikamıza rəhbərlik etdiyi vaxtlara nəzər yetirmək lazımdır.

Heydər Əliyev uzaqgörən, qətiyyətli siyasətçi olduğunu hələ ölkəyə ilk dəfə rəhbərlik etdiyi 1969-82-ci illərdə sübut etmişdir.

**Heydər Əliyevin 1969-1994-cü illərdəki siyasi fəaliyyəti**

Ulu öndər ilk dəfə hakimiyyətə gələndə- 60-cı illərin axırlarında- Azərbaycan iqtisadi və mədəni baxımdan tənəzzül dövrünü yaşayırdı. O zaman məhz Heydər Əliyevin gəlişi ilə cəmiyyət həyatının bütün sahələrində sürətli yüksəliş, milli ruhun inkişafı və mənəviyyatın tərəqqisi dövrü yaşandı. Heydər Əliyev öz parlaq siyasi zəkası və istedadı sayəsində yeni Azərbaycanı, onun bugünkü gerçəkliklərini yaratmış və gələcəyə aparan yolları müəyyən etmişdir. Məhz buna görə də Azərbaycan tarixinin 1969-cu ildən bəri yaşanan dövrü Heydər Əliyevin adı ilə sıx bağlıdır və tariximizə Heydər Əliyev dövrü kimi həkk olmuşdur.

Qısa vaxt ərzində onun təşəbbüsü ilə mühüm sənaye müəssisələri Azərbaycanın şəhərlərində inşa edilib, təsərrüfat, elm və təhsil sahələrində qətiyyətli islahatlar həyata keçirilib.

Azərbaycan xalqının xilaskar oğlu Heydər Əliyevin ikinci hakimiyyət dövrü isə müstəqillik qazandığımız çox çətin və mürəkkəb illərə təsadüf edir. 1990-cı illər Azərbaycanın tarixinə ağır faciələrin yaşandığı bir dövr kimi daxil olub. Həmin vaxt Sovetlər birliyi süqut edəndə 15 ittifaq dövləti sırasında Azərbaycan yeganə ölkə oldu ki, ərazisinin 20 faizi işğal edildi, 20 mindən çox şəhid verdi, 1 milyondan çox soydaşımız isə qaçqın və məcburi köçkün vəziyyətinə düşdü. Sovet rejiminin qəddarlığı sayəsində Azərbaycanda baş verən 20 Yanvar qırğınlarından sonra Heydər Əliyev doğulduğu Naxçıvana qayıtdı və burada xalqın iradəsi ilə Ali Məclisə rəhbərlik etməyə başladı. Məhz onun qətiyyəti və fədakarlığı sayəsində insanlar müdrik rəhbərin ətrafında sıx birləşərək onun timsalında xilas yolunu tapdılar.

Ulu Öndərin müstəqillik dövründə həyata keçirdiyi çox mühüm islahatlar sırasında ordu quruculuğunda görülən işləri də qeyd etmək lazımdır. 1994-cü ilin qışında Azərbaycan Ordusunun cəbhədəki ilk uğurlu əməliyyatının müəllifi məhz Ulu Öndərdir. Cəbhə xəttindəki hərbi hissələrə, təlim meydanlarına gedən ölkə başçısı əsgər və zabitlərlə görüşüb onları müqəddəs bir amal naminə - gənc müstəqil Azərbaycanın ərazi bütövlüyünün qorunması uğrunda mübarizəyə ruhlandırırdı. Həmin döyüşlərdə öndə gedən komandirlərin əksəriyyəti isə Heydər Əliyev Məktəbinin- C.Naxçıvanski adına Hərbi Liseyin yetirmələri idi. Bu təhsil ocağının ildönümü mərasimlərindən birində salonda əyləşən zabitlərə, kursantlara xitabən dahi rəhbər təsadüfi demirdi*:*

> *"Sizlərə baxanda sonsuz fərəh hissi duyuram ki, mən Azərbaycanda belə bir məktəb yaratdım və bu məktəbin yetirmələri mənə doğma övladlarım qədər əzizdir".*

Heydər Əliyev özünün siyasi fəaliyyətinin bütün dövrlərində dövlətçilik siyasəti ilə Cənubi Qafqazda demokratik idarəçiliyin əsaslarını yaratdı. Hələ hakimiyyətə gəldiyi ilk dövrlərdən Heydər Əliyev cəmiyyətdə iqtisadiyyatın elmi əsasları haqqında bildirdiyi fikirləri qiymətlidir. O, əvvəllər kommunist rejimi dövründə və sonralar isə sərbəst bazar iqtisadiyyatı şəraitində işləmişdir. O müsahibələrinin birində qeyd edir ki,

*“Sovet İttifaqının, Kommunist partiyasının rəhbərlərindən biri olmuşam... Keçmişdəki istər dövlət, istərsə də siyasi fəaliyyətimdə mən o vaxtki mövcud rejim çərçivəsində hər halda ədalətin və demokratiya prinsiplərinin bərqərar olmasına çalışmışam...”*[1]

Heydər Əliyevin dövlətçilik fəaliyyətinin əsasını demokratiya və ədalət təşkil edir. O ictimai ədalət və demokratik prinsipləri rəhbər tutaraq fəaliyyət göstərdi:

*“Cəmiyyətin həyatında mənəvi amillərin rolunun daha da güclənməsi irəliyə doğru hərəkətimizi surətləndirir.”*[2]

Vaxtı ilə söylənilən bu fikirlər öz aktuallığını itirməmişdir. Onun bu fikirləri real həyatla, real fəaliyyətlə bağlıdır. O idarəçilik proesində də özünəməxsusluğu ilə fərqlənir. Belə ki burada elm və fəaliyyət vəhdətdə götürülür. Elmlə fəaliyyətin birliyi əsasında Azərbaycan aqrar əhəmiyyətli bir ölkə səviyyəsindən, inkişaf etmiş bir ölkə səviyyəsinə çatdırıldı. Məhz elmlə fəaliyyətin vəhdəti sayəsində Azərbaycan müstəqillik qazandıqdan sonra, geriliyə, dağınıqlığa son qoyuldu, dövlətçilik ənənələri gücləndirildi. Bütün bunlar Azərbaycan Respublikasının gələcəkdə müstəqil dövlət kimi formalaşması üçün mühüm şərt oldu.

Beləliklə, Heydər Əliyevin Azərbaycanda dövlətçilik şüurunun güclənməsinə yönəldilmiş fəaliyyəti nəticəsində müstəqillik əldə edilməsindən sonra öz bəhrəsini verdi. Məhz onun siyasəti nəticəsində respublikada onun suverenliyinə və müstəqilliyinə xələl gətirən bütün problemlər aradan qaldırıldı. Sözsüz ki, bu prosesdə Heydər Əliyev fenomeni xüsusi qeyd edilməlidir. Onun kütləsləri həm daxili, həm də xarici düşmənlərə qarşı səfərbəretmə bacarığı hamımızın yaxşı xatirindədir. Məsələn, 1994-cü ilin oktyabrında bir neçə gün ərzində Ulu öndər Heydər Əliyev öz diplomatik və siyasi fəaliyyəti nəticəsində bu mübarizədə qələbə çaldı. Oktyabrın 4-ü və 5-də gecə, öz xilaskarına bir vətəndaş təəssübkeşliyi ilə dayaq olan Azərbaycan xalqı respublika prezidentinin sözünü eşitmək üçün Azərbaycan dövlətini, Azərbaycan dövlətçiliyini və nəhayət, suveren Azərbaycan Respublikasını müdafiə etmək üçün meydanlara axışdı. Meydanda olan xalqa nə vəzifə, nə pul, nə də sərvət lazım idi. Xalqı ancaq öz ölkələrinin, dövlətinin taleyi maraqlandırırdı. Xalqı meydana gətirən əsas səbəb ilk növbədə Ulu öndərə olan səmimi, təmənnasız məhəbbət, müstəqilliyimizə xor baxanlara isə nifrət idi.

Ümummilli Lider daxili və xarici qüvvələrin dövlət çevrilişi, sui-qəsd və təxribat cəhdlərinə baxmayaraq öz həyatı, sağlamlığı və yorulmaz fədakar əməyi hesabına müstəqil Azərbaycan dövlətini qurdu və möhkəmlətdi. Heydər Əliyev demokratik hüquqi dövlət qurmaq, köklü islahatlar aparmaq üçün ilk növbədə ölkədə ictimai-siyasi sabitliyi, qanunun aliliyini bərqərar etdi, cəmiyyətdə hökm sürən hərc-mərcliyə və özbaşınalığa birdəfəlik son qoydu. Ulu Öndərin 1994-cü ildə imzaladığı Cinayətkarlıqla mübarizəyə yönəlmiş tarixi fərmanı qanunvericiliyin və hüquqi norma və prinsiplərin möhkəmləndirilməsində əsaslı dönüş yaratdı.

Zəngin dövlətçilik təcrübəsinə malik olan böyük strateq Heydər Əliyev hüquqi dövlətin Azərbaycan modelini ilk milli Konstitusiyanı yaratmaqla gerçəkləşdirdi. Heydər Əliyevin müəllifi olduğu 1995-ci ildə ümumxalq səsverməsi yolu ilə qəbul olunmuş Azərbaycan Respublikasının Konstitusiyasında hüquqi dövlətin bütün prinsipləri-qanunun aliliyi, insan hüquqlarının müdafiəsi, hakimiyyət bölgüsü, konstitusiya nəzarəti prinsipləri təsbit olundu, insan haqlarının təminatı dövlətin ali məqsədi kimi bəyan edildi.

İdarəçilik tariximizdə müstəsna xidmətləri olan Heydər Əliyevin siyasi fəaliyyətinin əsas xüsusiyyətlərindən biri olan ədalətlilik və obyektivlik prinsipləri xalqımızı dövlətçilik ruhunda tərbiyə edilmənin əsasını təşkil etmişdir. Azərbaycan müstəqil olduqdan sonra, 90-cı illərin əvvəllərində meydanda olan bir çox siyasi xadimlər 1918-1920-ci illərin dövlətçilik ideyalarını olduğu

---

[1] Heydər Əliyev Müstəqilliyimiz əbədidir. II kitab. Bakı, 1997 s. 192.
[2] Heydər Əliyev «Fəal həyat mövqeyinin formalaşdırılması: mənəvi tərbiyənin təcrübəsi və aktual problemləri s. 12.

kimi qəbul edərək hazırki şərait üçün ideallaşdırmaq istədikləri halda, Ulu öndərimiz Heydər Əliyev bizim üçün müqəddəs əhəmiyyəti olan bu tarixi hadisəyə hörmətlə yanaşmağı, hissə qapılmamağı, obyektivliyi tövsiyyə edirdi. O, Respublika gününə həsr edilmiş toplantıda qeyd edirdi ki, "güman edirəm ki, bu gün bu bayramı qeyd edərkən, ilk Azərbaycan demokratik respublikasının yaranmasına və fəaliyyətinə hörmət və ehtiramımızı bildirərkən bir daha və bir daha o dövrü təhlil etməli, o dövrün nailiyyətlərindən istifadə etməli, bəhrələnməli, o zaman buraxılan səhvlərə yol verməməliyik. O dövrdə Azərbaycan Demokratik Respublikasının zəiflədən amillərin indi də mövcud olduğunu görərək, mütləq onları aradan qaldırmalıyıq."[1]

Məhz Heydər Əliyev idarəçilik məktəbinin siyasi proseslərə qoyduğu bir çox tələblər olmasaydı, hazırki Azərbaycan Respublikasının da taleyi birinci dövlətimizə bənzəmiş olardı. Onu da nəzərə almaq lazımdır ki, tarixi faciənin təkrar olunmasına az qalmışdı. Heydər Əliyev çıxışlarının birində qeyd edir ki,

> *"Üç ildir ki, biz müstəqil dövlət şəraitində yaşayırıq. Amma bir nəzər salın, görün, bu üç ildə Azərbaycan xalqının başına nə kimi bəlalar gətiriblər."*

Keçən ilin (1993-cü ilin) iyun ayında Azərbaycan Respublikası vətəndaş müharibəsi həddinə gəlib çıxmışdır. Bu vətəndaş müharibəsinin qarşısını xalqın iradəsi, dahi rəhbərin müdrik siyasəti Azərbaycanın mütəfəkkir qüvvələrinin birliyi aldı. Vətəndaş müharibəsinin qarşısı alındı. Lakin bir il keçmədi ki, ayrı-ayrı cinayətkar qruplar, antimilli qüvvələr Azərbaycanı parçalamaq dağıtmaq üçün yeni təxribatlara əl atdılar, dövlət çevrilişi etməyə cəhd etdilər. Bunların da qarşısı alındı.[2]

Əlbəttə ki, Heydər Əliyev bu tarixi hadisələrə nəzarət edən, həmin ictimai siyasi hadisələrin içərisində olub, onun gedişinə təsir göstərən, bütün proseslərin gedişatını əvvəlcədən görən tarixi qəhrəmandır desək, səhv etmərik. Məhz Heydər Əliyev Azərbaycan dövlətinin düşdüyü siyasi böhranın gedişini əvvəlcədən gördü, qiymətləndirdi və istiqamətləndirdi. Onun dövlətçilik siyasətinin yüksək demokratik idarəçilik məharəti məhz bundan ibarətdir.

Yeni Azərbaycanda dövlətçilik şüurunun formalaşmasında ulu öndərimiz Heydər Əliyevin fəaliyyətinin böyük və əvəzsiz rolu oldu. Heydər Əliyevin yaratdığı Yeni Azərbaycan Partiyası xalqı və cəmiyyəti öz ətrafında birləşdirməyi bacaran ictimai-siyasi təşkilatdır. Bu partiya Azərbaycan Respublikası üçün real gerçəkliyi, tarixi, ictimai həqiqətin özünü təmsil edir. Azərbaycanda dövlətçilik, mənəvi ideoloji, hüquqi təsisatların strukturunda qeyri-müəyyənlik o vaxta kimi davam edir ki, Azərbaycan suverenlik dövründə milli lider problemi həll olunmur. Ümumiyyətlə, tarixi gerçəkliklər sübut edir ki, suveren ölkə, demokratik dövlət quruculuğu milli liderlərdən başlayır. Ulu öndərimizin Heydər Əliyevin bu baxımdan yenidən hakimiyyətə gəlməsi ilə Azərbaycan dövlətçiliyi öz təsdiqini tapdı. Azərbaycanda siyasi-iqtisadi, hüquqi sahələrdə yaranmış yüksəlişlər milli liderimiz Heydər Əliyevin uzaqgörənliyi nəticəsində yeni dövrə qədəm qoydu. Postsovet məkanında hələ sona çatdırılmamış işlər məhz milli liderimizin hakimiyyətə qayıdışından sonra öz müsbət həllini tapdı. Ulu öndərin müdrikliyi, ağlı və təcrübəsi nəticəsində hərbi təcavüzlərə qarşı yönəldilmiş mübarizədəki qələbələr bir-birini əvəz etdi. Ümumilli lider Heydər Əliyev hakimiyyətə yenidən qayıdışının ilk günlərində demişdir:

> *"Azərbaycan Respublikasının müstəqil dövlət olması tarixi bir hadisədir. Biz, Azərbaycanın indiki nəsli, bu imkanlardan bütün sahələrdə səmərəli istifadə etməliyik."*[3]

Hakimiyyətə qayıtdığı ilk dövrlərdə o Azərbaycan xalqının uğurlu gələcəyini düşünərək ölkənin bütün siyasi qüvvələrini birləşdirərək konkret addımlar atdı. Bu

[1] Heydər Əliyev Müstəqilliyimiz əbədidir. II kitab. Bakı, 1997, s. 20
[2] Yenə orada, s.395
[3] Heydər Əliyev Müstəqilliyimiz əbədidir. I kitab. Bakı, 1997, s.134.

ümummilli liderimizin xilaskarlıq missiyası idi.

Heydər Əliyevin xilaskarlıq missiyasını qiymətləndirən akademik Ramiz Mehdiyev yazır:

*"Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsinin ağrılarını yaşayan dövlətimizin gələcək inkişaf strategiyasının dərin elmi və məntiqi əsaslarla müəyyənləşdirən, xalqı milli tənhalıq hissindən və həmin dövrdə baş vermiş sosial-iqtisadi və ictimai-siyasi proseslərin nəticəsində yaranmış milli natamamlıq kompleksindən xilas edən, qələbə əzmini öz vətənpərvərlik ruhu ilə gücləndirən Heydər Əliyev tarixi şəraiti düzgün qiymətlədirərək, bu dövrün minimal itkilərlə və faciəsiz keçirilməsini təmin etdi. Az vaxt ərzində ölkədə hakimiyyətsizliyə və total özbaşınalığa son qoyulması, vətəndaş qarşıdurmasından ümummilli həmrəyliyə keçilməsi, atəşkəs rejiminə nail olmaqla xalqın genofondunun əbəs yerə məhv olmasının qarşısının alınması onun böyük və çoxşaxəli fəaliyyətinin nəticəsi olmaqla, qeyri-müəyyənliklər içərisində çaşıb qalmış cəmiyyətə yenidən dirçəlmək, öz qüvvələrini quruculuq işlərinə səfərbər etmək imkanı verdi."*[1]

Heydər Əliyev Vətənin hər bir guşəsini sevməyi və qədrini bilməyi tövsiyyə edirdi.

*"... Bir çoxları belə hesab edirlər ki, əgər kim hansı yerdə doğulub-böyüyübsə, o, həmin yeri başqasına nisbətən daha çox sevir. Bu belə deyil. Ümumiyyətlə, biz Azərbaycanın hər bir yerini doğma vətən kimi sevməliyik."*

Azərbaycan xalqı hələ 1988-ci ildən mitinqlərlə respublikanın xilas yolunu yalnız Heydər Əliyevdə görürdü. Onun respublikaya qayıtmasını təkidlə, qətiyyətlə tələb edirdilər. Lakin nə keçmiş kommunist rəhbərləri, nə də silahlı çevriliş yolu tutmuş yalançı demokratlar Heydər Əliyevin gəlməsinə tərəfdar deyildilər. Çünki onları xalqın taleyi maraqlandırmırdı. Azərbaycanda vətəndaş qarşıdurması yarandığı zaman Əbülfəz Elçibəy , xalqı bu acınacaqlı durumdan xilas etmək üçün Heydər Əliyevi Bakiya dəvət etdi. Heydər Əliyev Elçibəyin dəfələrlə etdiyi təkidlərdən və xalqın tələbindən sonra nəhayət iyun ayının 9-da Bakıya gəldi. O deyirdi ki,

*"Mən buraya tamam könülsüz, tez-tələsik yox, adamların təzyiqindən yox, yaranmış vəziyyətə görə gəldim, çünki xalqın taleyi həll olunurdu."*[2]

Taleyin ən mürəkkəb dövrlərində Azərbaycan xalqının harayına çatan Heydər Əliyevin qərarlarından biri-Vətənə qayıtmaq, canından artıq sevdiyi, ömrünün çoxunu inkişafına, çiçəklənməsinə həsr etdiyi Azərbaycanı müstəqil dövlət kimi tanıtmaq və möhkəmlətmək amalı idi.[3]

Millətimizin bütün müsbət və ali keyfiyyətlərini özündə cəmləyən Ulu öndər Heydər Əliyev əldə etdiyi bütün uğurlarını yorulmaq bilməyən əməksevərliyi sayəsində əldə etmişdir. Tarixdə elə insanlar var ki, onların əzəmətini heç bir sözlə ifadə etmək mümkün deyil. Heydər Əliyev də belə insanlardandır. Bu adın ucalığı bütün metaforaları kölgədə qoyur. Biz Heydər Əliyevi Ulu öndər, "müdrik insan", "dahi şəxsiyyət" adlandırırıq. Amma etiraf edək ki, bunlar onun milli təfəkkürümüzdə əbədilik qazanan statusunun yalnız müəyyən bir hissəsini ifadə edir. Heydər Əliyev Azərbaycanın milli varlığının ümumi çevrəsinin ən yüksək nöqtəsini təşkil edən zirvədir.

**Heydər Əliyev Azərbaycan xalqının xilaskarı kimi**

Siyasət nəhəngi Heydər Əliyevin Azərbaycanda ikinci dəfə hakimiyyətə gəlişi zamanı da eynilə ilk dəfə olduğu kimi, respublikanın üzləşdiyi ağır sosial-iqtisadi, mənəvi problemlə qarşılaşmışdı. Ulu öndər 1993-cü ilin iyununda kifayət qədər böhranlı bir dövrdə xalqın çağırışına cavab verərək, Azərbaycanın idarəçilik sükanı arxasına keçmiş, qısa müddətdə milli dövlətçilik doktrinasını irəli sürərək onun sürətli icrasına başlamışdır.

---

[1] Ramiz Mehdiyev. Milli məfkurə, dövlətçilik, müstəqillik yolu ilə: məqalələr, çıxışlar, müsahibələr. I-II c. Bakı, 1997, s. 206-207.

[2] Heydər Əliyev. Yazıçı Aleksandr Proxonovla müsahibə. Müstəqilliyimiz əbədidir, Bakı, 1997, s. 60; "Azərbaycan" qəzeti 8, 12 avqust 1993.

[3] Qasım Hacıyev Heydər Əliyevin Dağlıq Qarabağa erməni iddialarına qarşı mübarizəsi, səh 20.

 

Dövlətçiliyimizin müqəddəratının həll edildiyi 1993-cü ilin iyun günlərində xalqın təkidli tələbi ilə Heydər Əliyevin ölkə rəhbərliyinə qayıdışı Azərbaycanı məhv olmaq fəlakətindən xilas etdi. Heydər Əliyevin dövlətçilik fəaliyyəti sayəsində Azərbaycan uçurumun bir addımlığından geri döndü, itirmək üzrə olduğu siyasi və dövlət müstəqilliyini qoruyub saxlaya bildi.

Azərbaycan Respublikasının dövlət müstəqilliyi 1991-ci il oktyabrın 18-də elan olunsa da, onun əsl tarixi məhz Qurtuluş günündən başlanır. Çünki Ulu öndərimizin dediyi kimi,

> *“Tarix dəfələrlə sübut etmişdir ki, xalqın əvəzsiz milli sərvəti olan müstəqilliyin qorunması onun əldə edilməsindən qat-qat ağır və mürəkkəb vəzifədir.”*

Bu, zəruri və tarixi qayıdış idi. Bu, xalqın ümidlərinin bərpası idi, onun öz xilaskarına qovuşması idi! Bu, Azərbaycanın tarix səhnəsindən həmişəlik silinmək təhlükəsindən qurtuluşu idi! Bu, “ölüm-qalım” dilemmasının xalqın, millətin, dövlətin xeyrinə həll olunması idi! Bu, azadlıq və dövlətçilik rəmzinə çevrilən real və əfsanəvi liderin: “Müstəqilliyimiz dönməzdir, qətidir və əbədidir” fikrinin təsdiqi idi!

Ulu öndər bir ictimai-iqtisadi formasiyadan digərinə keçid dövründə respublikanın qarşısında duran strateji vəzifə və hədəfləri düzgün müəyyənləşdirməklə, dünyanın qabaqcıl dövlətlərinin təcrübəsində sınaqdan uğurla çıxmış, müsbət nəticələri sübut olunmuş inkişaf kursunun Azərbaycan gerçəkliyinə adekvat modelini yaratdı.

Zəngin təcrübəyə və güclü təfəkkürə malik siyasətçi Heydər Əliyevin demokratiya epoxasında müstəqil dövlətimizə rəhbərliyi dövründə Azərbaycanda dövlət quruculuğu, iqtisadi inkişaf, beynəlxalq əlaqələrin gücləndirilməsi istiqamətində davamlı proses başlandı, ölkədə bütün sahələr üzrə köklü islahatlar aparıldı. Müstəqillik yolunda inamla addımlayan Azərbaycan dünyada baş verən demokratikləşmə prosesinin iştirakçısına çevrildi.

Dünyanın siyasi axarını, nəhəng dövlətlərin maraqlarının çarpazlaşan nöqtələrini çox gözəl bilən Heydər Əliyev dərin zəkası, siyasi uzaqgörənliyi və polad məntiqi ilə hər şeyi yerinə qoya bildi. Təcrübəli dövlət xadiminin böyük səyləri nəticəsində ölkədə ictimai-siyasi sabitlik bərpa olundu. Azərbaycanın yaxın gələcəkdə dünya siyasətində geosiyasi mövqeyini müəyyən edən siyasi-iqtisadi konsepsiya işlənib hazırlandı. Böyük strateq və mahir diplomat Heydər Əliyev müstəqil Azərbaycanı siyasi çaxnaşmalardan məharətlə çıxarıb, strateji mövqelərini bərpa etdi, ona sabit ölkə imici qazandırdı.

Bütün bunlarla yanaşı, Heydər Əliyev çox böyük məharətlə özünün neft strategiyasını işləyib hazırladı. Ümummilli lider böyük uzaqgörənliklə dünyanın enerji tələbatının günbəgün artdığını görür, neft diplomatiyası dövrünün başlandığını və bu diplomatiyada ölkəsinin qazanacağı iqtisadi və siyasi dividentləri yaxşı duyurdu. Dünyanın söz sahibi olan ölkələrinin nəhəng neft şirkətləri ilə intensiv danışıqlara başlandı. 1994-cü il sentyabrın 20-də “Əsrin müqaviləsi” imzalandı. Bunun çox böyük iqtisadi dəyəri ilə yanaşı, siyasi əhəmiyyəti ondan ibarət idi ki, Azərbaycan dünya iqtisadi siyasətinin maraq mərkəzinə çevrildi.

Müstəqilliyimizin on ili -1993-2003-cü illər ərzində dahi Heydər Əliyev “siyasət mümkün olanı etmək deyil, mümkünsüzü bacarmaq sənətidir” məşhur kəlamda söylənildiyi kimi, düşünülmüş və uzaqgörən siyasəti sayəsində Azərbaycan üçün, xalqımız üçün mümkünsüz görünən hər şeyin öhdəsindən uğurla gəldi, ölkəmizin müstəqilliyini dönməz, əbədi və daimi etdi, Azərbaycan demokratik hüquqi dövlət quruculuğu yolu ilə əzmlə irəlilədi və gələcək inkişafın strateji hədəflərini müəyyən etdi. O inkişaf ki, sonrakı illərdə müstəqil Azərbaycanın daha da qüdrətlənməsi və tərəqqisi üçün möhkəm təməl və potensial rolunu oynadı.

Ümummilli Lider həm də Azərbaycan tarixində ən görkəmli dövlət xadimi kimi əbədi bir milli sərvət - Heydər Əliyev dövlətçilik məktəbini yaratdı. Ulu Öndərin 2003-cü ildə tarixi müraciətində xalqa müəyyənləşdirdiyi siyasəti davam etdirə biləcək dəqiq ünvanı göstərdi:

> *"İnanıram ki, mənim axıra çatdıra bilmədiyim taleyüklü məsələləri, planları,*

*işləri sizin köməyiniz və dəstəyinizlə İlham Əliyev başa çatdıra biləcək. Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm"*[7].

Zaman Heydər Əliyevi bu inamını təsdiq edir və Ümummilli Liderin layiqli davamçısı möhtərəm Prezidentimiz cənab İlham Əliyev Azərbaycana bacarıqla rəhbərlik edir, öz praqmatik və müdrik siyasəti ilə ölkəmizi irəli aparır. Dövlətin sükanının etibarlı əllərdə olduğunu görən xalq öz Prezidentinə daim dəstək verir və onun arxasınca inamla gedir.

Qədim İpək yolunun bərpası ideyasını qaldırmaq və onun həyata keçirilməsi işini təşkil etmək isə Heydər Əliyev şəxsiyyətinin regional yox, beynəlmiləl xarakter daşıdığını sübut etdi. Böyük İpək yolu ilə bağlı 30-dan çox dövlətin müasir inkişafında bu yolun müstəsna rolu ulu öndərin adı ilə bağlıdır.

## Azərbaycan tarixində Heydər Əliyev fenomeni

Adətən Heydər Əliyev fenomenini müəyyənləşdirmək üçün onu tanımış şəxsiyyətlərlə müqayisə edirlər. Onun gördüyü işləri göz önünə gətirsək, onun xalqımız üçün göstərdiyi xidmətlər Azərbacan tarixində özünəməxsus yer tutumuş bir çox dövlət xadimləri ilə müqayisə etmək olar. Məhz bu cəhətlərə görə, H.Əliyevin dövlətçilik siyasəti təkcə Cənubi Qafqazda deyil, bütün postsovet məkanında ən demokratik idarəetmə nümunəsidir. Heydər Əliyev də Azərbaycan Respublikasına rəhbərlik etdiyi illərdə milli dövlət müstəqilliyini, milli dövlət şüurunu təzyiqlərdən, hücumlardan qorumuş, dövlətin gələcək inkişafını öz müdrik strategiyasına əsasən təmin etmişdir.

Azərbaycanın Heydər Əliyevin adı ilə bağlı olan sürətli inkişafının bu gün də yüksək dinamika ilə davam etməsi o dövrdən başlayan yüksəliş strategiyasının böyük zaman kəsiyini əhatə edən dövlətçilik konsepsiyasını yerinə yetirdiyini qətiyyətlə sübut edir. Ümummilli Lider Heydər Əliyev həmişə Azərbaycan xalqının mənafeyini düşünən şəxsiyyət olub, bu istiqamətdə apardığı ardıcıl və məqsədyönlü siyasət onun bütün fəaliyyətinin əsasını təşkil edib. Bu gün Azərbaycanda həyata keçirilən böyük tədbirlər məhz Heydər Əliyevin ölməz ideyalarının həmişəyaşar, əbədi olduğunu bir daha sübut edir. Ulu Öndərin uzaqgörənliyi, müdrikliyi və fədakarlığı bu şəxsiyyəti təkcə Azərbaycan xalqının deyil, bütün dünya azərbaycanlılarının liderliyinə yüksəldib, ömür yolu isə vətənə xidmətin parlaq nümunəsinə çevrilib. Bütün həyatını xalqına və vətəninə həsr etmiş Ümummilli Lider Heydər Əliyev Azərbaycan xalqının tarixinə müstəqilliyimizin memarı və qurucusu kimi daxil olub.[1] Ulu Öndərin yorulmaz, çoxşaxəli və zəngin fəaliyyəti Azərbaycanı sürətli inkişaf yoluna çıxarıb və şübhə yoxdur ki, yaxın illərdə ölkəmiz dünyanın inkişaf edən güclü dövlətlərindən birinə çevriləcək.

Hələ sağlığında əfsanələşən, siyasət olimpini fəth etmiş nadir şəxsiyyət Heydər Əliyev haqqında dünyanın məşhur simalarının necə heyranlıqla, ehtiramla danışdıqlarının şahidiyik. Müasiri olan dünya liderləri, tanınmış dövlət adamları və siyasi xadimləri tərəfindən dünya miqyasında böyüklüyü etiraf edilən, o cümlədən ABŞ-ın sabiq Prezidenti Corc Buşun "şəksiz lider", Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğanın "türk dünyasının tanınan və sevilən lideri", Rusiya Prezidenti Vladimir Putinin "siyasi nəhəng", Fransanın sabiq Prezidenti Jak Şirakın "qeyri-adi şəxsiyyət" adlandırdıqları Heydər Əliyev şəxsiyyətinin nəhəngliyi bu günlərdə yenidən göz önündə canlanır, qəlbimizdə bir daha qürur və iftixar hissləri baş qaldırır.

Heydər Əliyev Azərbaycanın dünyada layiqli yerini tutması üçün uzun illər çalışdı, müstəqil Azərbaycanın memarı və qurucusu kimi tarixdə yerini tutdu. Heydər Əliyev barədə dünyanın tanınmış şəxslərinin ifadə etdiyi fikirlər bir daha onun nə dərəcədə müdrik, eyni zamanda, praqmatik bir lider olduğunu təsdiqləyir. Ümummilli lider əsl

[7] İlham Əliyev və siyasi varisliyin təntənəsi – Xalq qəzeti. 25 dekabr 2018

[1] T. Əfəndiyev Heydər Əliyev və milli – mənəvi dəyərlərimiz. Bakı-2011, s 27

məktəbdir, başqa xalqların həsəd apardığı dövlətçilik məktəbi!

Ulu öndər Heydər Əliyev haqqında adi söz demək mümkün deyil. Onun barəsində səmimi ifadə edilən hər bir fikirdə bir ucalıq, yüksək məna çaları var. Dünyanın müxtəlif ölkələrinin siyasi liderlərinin Ümummilli liderlə bağlı söylədiklərini bir yerə cəmləşdirsək, dünyanın ən dahi siyasi liderlərindən birinin "siyasi portreti" alınar. Və hər kəs də onu dərhal tanıyar:

> *"Bu, Heydər Əlirza oğlu Əliyevdir. Türk və müsəlman dünyasının fəxri, Azərbaycan xalqının qüdrətli oğlu! Dünya siyasətinin nəhəngi və hətta rəqibləri tərəfindən yüksək qiymətləndirilən nadir bir şəxsiyyət"!*

Heydər Əliyev XX əsr Azərbaycan siyasətinin ən parlaq siması və XXI əsr müstəqillik kursunun memarıdır. Onun həyata keçirdikləri, nəzəri ifadə etdiyi, praktiki diplomatiyaya verdiyi töhfələr hələ uzun illər araşdırılacaq. Və hər dəfə də yeni bir incəlik tapılacaq. Bu proses sonsuzdur.

Azərbaycan xalqı xoşbəxtdir ki, onun Heydər Əliyev kimi Ulu Öndəri, dünyanın hörmətlə yanaşdığı və qəbul etdiyi ümummilli lideri var. Və bu gün hər birimiz dərk edirik ki, müstəqil Azərbaycan dövləti bütün həyatı və fəaliyyəti tariximizə qızıl hərflərlə həkk olunmuş Heydər Əliyevin şah əsəridir. Şübhə yoxdur ki, xalqımız onun müəllifini özünün tarixində və qəlbində əbədi yaşadacaq, Azərbaycan və Heydər Əliyevin adı əsrlər boyu bütün dünyada qoşa səslənəcəkdir.

## ƏDƏBİYYAT SİYAHISI

1. Heydər Əliyev. Müstəqilliyimiz əbədidir: çıxışlar, nitqlər, bəyanatlar, məktublar, müsahibələr. I kitab: iyun, 1993 – may, 1994 / bur. məsul R. Mehdiyev. – Bakı: Azərnəşr, 1997. 612 s.
2. Heydər Əliyev. Müstəqilliyimiz əbədidir: çıxışlar, nitqlər, bəyanatlar, məktublar, müsahibələr. II kitab: may, 1994 – dekabr, 1994 / bur. məsul R. Mehdiyev. – Bakı: Azərnəşr, 1997. 604 s.
3. Heydər Əliyev. "Fəal həyat mövqeyinin formalaşdırılması: mənəvi tərbiyənin təcrübəsi və aktual problemləri". Bakı, 25-27 aprel, 1979-cu il.
4. Ramiz Mehdiyev. Milli məfkurə, dövlətçilik, müstəqillik yolu ilə: məqalələr, çıxışlar, müsahibələr. I, II cild. Bakı, 2007.
5. Qasım Hacıyev. Heydər Əliyevin Dağlıq Qarabağa erməni iddialarına qarşı mübarizəsi. Bakı, 2014.
6. T. Əfəndiyev Heydər Əliyev və milli – mənəvi dəyərlərimiz. Bakı-2011
7. İlham Əliyev və siyasi varisliyin təntənəsi – Xalq qəzeti. 25 dekabr 2018